

**TELMAN İBRAHİMOV**
Azərbaycan Milli Elmlər Akademiyasının
aparıcı elmi işçisi

# MƏZAR ABİDƏLƏRİNDƏ "HƏYAT AĞACI" MOTİVİNİN MƏNŞƏYİ, SİMVOLİZMİ VƏ İKONOQRAFİYASI

Həyat ağacı ən qədim simvollardan biri kimi qəbir inventarı(keramika) üzərində eneolit dövründən müşahidə olunmağa başlayır. Simvolun yaranması əkinçilik mədəniyyətinin meydana gəlməsinə təsadüf edərək, dünya və həyat haqqında ilkin mücərrəd, simvolik və magik təsəvvürlərin formalaşması dövrünə təsadüf edir.

Məhsuldarlığın magik trəsir vasitəsilə artırılmasına inamın güclənməsi bu simvolun sakral iyerarxiyada əhəmiyyətrini bir qədər də artırdı. Yaranması madərşahlıq dövrünə təsadüf edən simvol Ana İlahənin məhsuldarlıq kəramətini özündə ehtiva edərək, onun floral simvoluna çevrildi.

Həyatın əbədi davam etməsini daima arzulayan ibtidai insan – əbədi həyat rəmzi kimi məhz Ağac motivini seçir. Təbiət qanununa əsasən, istənilən ağacın ölməzdən(qurumaqdan) əvvəl özündən tum, tozlama və ya tumurcuqlanma vasitəsilə yeni həyata başlanqıc vermə bacarığı – ağac motivinin "Əbədi Həyat"ın simvolu kimi təsbit olunmasında əsas rol oynamışdır.

Erkən Şərq sivilizasiyaların yaranması dövründə dünya və həyat haqqında təsəvvürlərin əsatirlər vasitəsilə mənimsənilməsi "Həyat ağacı" simvolunu əsatirlərin predmeti edərək, onu əsas kosmoqonik simvollardan birinə çevirir.

Mesopotamiya (Sumer-Akkad-Babil-Assur) sivilizasiyasının mədəni təsir dairəsində olmuş Cənubi Qafqaz tayfaları ideologiyasında "Həyat ağacı" simvolunun məzmunu - Sümerlərin "Bilqamıs dastanı"ndan qaynaqlanmağa başlayır: Əbədi həyat, ölməzlik əldə

etmək istəyən Bilqamıs adlı Sümer hökmdarı əjdaha Xumbabanın qoruduğu müqəddəs Sidr meşəsindən "Həyat ağacını" əldə edərək, onu özünün paytaxt şəhərində əkib qulluq etməklə - ölməzlik, əbədi həyat əldə etmək arzulayır. Əjdahaya qalib gələrək, əldə edilmiş "Həyat ağacı" ilə geri qayıdan Bilqamıs yolunu azaraq, yeraltı dünyaya düşür. Buradan işıqlı dünyaya çıxmağın yeganə qiyməti "Həyat ağacı"nın axirətdə qoyması idi. Paytaxt Uruka əliboş qayıdan Bilqamıs adi insan həyatını yaşayaraq, vəfat edir.

Qədim dövrdə Azərbaycan ərazisində yaşamış Skit tayfaların dünyagörüşündə də "Həyat ağacı" əbədi həyat ideyasını ifadə edən kosmoqonik simvol olmuşdur. Skitlərə görə "Əbədi həyat ağacı" üç-pilləli dünya quruluşunu simvolik tərzdə əks edir. "Həyat ağacı"nın budaq və yarpaqları - İlahi aləmi (Göy [Tenqri]), gövdəsi – fiziki aləmi(Umay İlahə [Yer-Su]), kökləri isə - Axirət aləmini(Erlik [Yerlik]) işarələndirmişlər. Bu üc aləmi(həyatı) birləşdirən kosmik "Həyat ağacı" – əbədi həyat ideyasını ifadə edərək, "İHəyat verən İlahi Ağac" simvoluna çevrilir.

Erkən orta əsrlərdə Cənubi Qafqazın bütpərəst Alban-Türk tayfaları da skit və hunlar tək ağacları ilahiləşdirmiş, onları sitayiş obyektinə çevirmişlər. Qafqaz Albaniyasında Pir-ağaclara ibadətin geniş yayılması barədə Alban tarixçisi Musa Kağankatlı özünün "Alban tarixi" əsərində nəql edir. Həyat ağacı statusuna və ilahi karamətə malik – "Pir ağac"lar əsasən - şimsək vurmuş ağaclardan seçilirdi və onlarda ilahi enerji(göydən enən Tenqri enerjisinin) olmasına inam mövcud idi. Belə "Pir ağaclar" qəbilənin, ailənin hamisi sayılaraq, bolluq məhsuldarlıq, ölməzlik bəxş edən Pirə çevrilərərk, sitayiş və qurbanvermə mərasimləri ilə əhatə olunurdu.

Həyat ağacı dini-mistik simvol kimi erkən türklərin şamanizm ideologiyasında da mühüm yer tutmuşdur. Şamanlar göyə, xeyirxah ruhlar aləminə və aşağı - bədxah ruhlar aləminə öz mistik səyahətlərini məhz "Həyat ağacı" vasitəsilə etmişlər.

İslamın Azərbaycanda yayılması ilə bir çox qədim, dayanıqlı simvollara yeni təfsirlər verilərək, onların İslam kontekstinə daxil etməsi baş verir. Belə qədim simvollardan biri olan "Həyat ağacı" simvolu da müqəddəs Quran və Hədislərdə özünün yeni təfsirini əldə edir.

İslam doktrinasına əsasən, "Həyat ağacı" cənnətdə bitən Tuba ağacı adlandırılmışdır. Bu ağac möminlərə, haqq yolu ilə həyatlarını başa vurmuş insanlara cənnətə düşdikdə bəxş edilirdi. Hədisə əsasən(əl-Buxari, ət-Tirmizi), Məhəmməd Peyğəmbər(s.ə.və s.) demişdir: "Məni görən və mənə iman gətirənlərə cənnətdə - Tuba ağacı bəxş olunacaq. Məni görməyib, fəqət İman gətirənlərə - 7 qat Tuba əğacı bəxş olunacaq. Tuba ağacının yarpaqları üzərində Allahın 99 gözəl adları yazılmışdır və hər cənnətə düşən şəxsə Tuba ağacı yarpaqlarından bəxş edilərək, yarpaq üzərində yazılmış Allahın isim xüsusiyyətini hiss etmək imkanı veriləcəkdir.

Məzarlar üzərində rast gəlinən "Həyat ağacı" motivinin digər bir məzmunu da Qurandan bəhrələnmişdir. Belə ki, Quranın "əl-İsra"(Merac) və "ən-Nəcm(Ulduz) surələrində göyün yeddinci qatında, Allahın dərgahı(taxtı) yanında bitmiş Sidrət əl-Müntəha ağacından bəhs edilir və o ağac fiziki aləmdə yaşayan insanların həyatı və ölümü ilə bilavasitə əlaqəlidir. Hər ilin şaban ayının 15-də Sidrət əl-Müntəha ağacı Allahın hökmü

ilə qəflətən titrəyir və onun bəzi yarpaqlrı ağacdan qoparaq məhv olur. Ağacın hər bir yarpağı yer üzündə(fiziki aləmdə) yaşayan konkret insanla əlaqəlidir. Yarpaq ağacdan qopduqdan bir il ərzində həmin yarpaqla əlaqəli olan insan dünyasını dəyişir.

Beləliklə, məzarlar üzərindəki simvolik "Həyat ağacı" təsvirinin simvolik konteksti kimi məzarda dəfn olunmuşun Sidrat əl-Müntəha ağacı vasitəsilə haqq dünyasına köçməsinə inam əks olunub. Məzarlar üzərində belə dini məzmunu əks edən Sidrat əl-Müntəha ağacının yarpaqları adətən dairəvi şəkildə, budaqların uclarında, ağacın perimetri boyu təsvir olunmuşlar. Sidrət əl-Müntəha ağacının belə ikonoqrafiyasına biz bilavasitə Sümer-Babil-Assur "Həyat ağacı" motivlərinin təsvirlərində rast gəlirik.

Məzarlar üzərindəki "Həyat ağacı" motivinin ikinci geniş yayılmış ikonoqrafik tipi incə sərv ağacınıntəsvirindən ibarətdir. Belə sərv ağacı təsviri orta əsrlərə aid əlyazma kitab və xəttatlıq lövhələrində(Hilya) rast gələn Tuba ağacına uyğundur. Məzar üzərindəki Tuba ağacının təsviri - məzarda dəfn olunmuş mərhumun cənnətə düşməsinə inamını və arzusunu əks edir.

Etiraf etmək lazımdır ki, məzarlarımız üzərindəki "Həyat ağacı" motivi dini kontekstli təsvirlə bərabər - dünyəvi kontekstli təsvir variantlarına da rast gəlinir. Dünyəvi kontekstli "Həyat ağacı"nın təsviri, ikonoqrafdik tipi və simvolizmi həyati müşahidələr və həyati təcrübədən irəli gələrək formalaşmışdır. Belə ki, məzarda yaşlı ağsaqqal adam, nəsilin lideri və ya ağbirçək dəfn olunduqda, məzar üzərində güclü gövdəli, çoxlu budaqları olan ağac təsvir olunmuşdur.

Gənc mərhumların, xüsusilə də - qızların dünyəvi kontekstdə tərtib olunmuş məzarları üzərində "Həyat ağacı" motivi əksər halda - incə və gözəl sərv ağacı şəkilində təsvir olunurdu. Bələ dünyəvi "Həyat ağacı" motivi məzar tərtibatının ümumi bəzək sisteminə və prinsipinə uyğunlaşdırılaraq, dekorativ transformasiya olunmuş şəkildə ifadə olunmuşdur. Dekorativləşmə prosesində "Həyat ağacı" motivi bəzən - "Həyat gülü" motivi ilə əvəz olunur. "Həyat gülü" motivi adətən məzarın baş-daşının yuxarı şiş hissəsini tamamlayaraq, tağvari baş-daşın üzərindəki mehrab tağının mərkəzində təsvir olunur və cənnətin gül-çiçəkli girişini simvolizə edir.

Nəticə olaraq, məzar simvolizmi sistemində əhəmiyyətli yer tutan və Azərbaycanın müxtəlif bölgələrində tez-tez rast gəlinən "Həyat ağacı"motivinin dini və dünyəvi kontekstlərdə fərqli ikonoqrafiyalara malik olmalarını etiraf etməliyik. Dini kontekstli "Həyat ağacı" motivlərinə daha az rast gəlinir və buna məzar ustalarının Quran və Hədisləri dərindən bilib-bilməməkləri təsir etmişdir. Məzar üzərində "Həyat ağacı" motivinin təsvirində hansı ikonoqrafiyaya üstünlük verilməsi məsələsi məzar sifarişçisindən də asılı idi.

Dünyəvi, dekorativ kontekstli "Həyat ağacı" motivi məzarlar üzərində daha çox rast gəlir. Bu amil simvolların xəlqi məzmunlarının məzar sənətkarlığında daha geniş yaylması ilə əlaqədardır.

Azərbaycanın müxtəlif bölgələrinin məzarları üzərində rast gəlinən "Həyat ağacı" motivinin bədii və dini kontekstləri ilə bərabər – fərqli bədii üslub xüsusiyyətləri də

mövcuddur. Belə ki, Naxçıvan-Qarabağ bölgəsinin məzarları üzərində "Həyat ağacı" motivi realizmə daha meyilli , tikmə və xalıların ağac və gül motivlərinə uyğun təsvir variantlarına daha çox rast gəlinir. Şirvan - Qazax bölgəsinin məzarlarında əksər halda "Həyat ağacı" təsviri həndəsiləşib, stilizə olunaraq, naxış şəklinə salınmışdır. Muğan bölgəsinin məzarlarında "Həyat Ağacı" daha çox gül-çiçək koluna bənzər şəkildə nəzərə çarpır. Qəbələ - Şəki bölgəsinin məzarlarında "Həyat ağacı" həddən ziyada incələşmiş, islimi motivli nəbati kompozisiyalar şəkilində ifadə olunmuşdur. Şabran-Quba-Qusar bölgəsinin məzarlarında "Həyat ağacı" motivi xəttatlıqla sintezdə nəzərə çarpır. Bununla belə bu bölgələrin məzarlarında sxematikləşmiş "Həyat ağacı təsvirlərinə də rast gəlinir.

Azərbaycanın əksər bölgələrinin məzarları üzərində rast gəlinən "Həyat ağacı" motivi əsasən baş-daş və sənduqələri bəzəyən mehrab tağının mərkəzində təsvir olunaraq – CƏNNƏT simvolizmini ifadə edir.

Məzarüstü dizaynlarda rast gəlinən dünyəvi, dekorativ mahiyyətli "Həyat ağacı" motivlərinin mənşəyini və "gizli" simvolizmini də birmənalı olaraq, xalqın dini – ideoloji və məınəvi dəyərlər sistemində axtarmaq lazımdır.

## ƏDƏBİYYAT


1. The Epic of Gilgamesh. A new translation. Penguin Books. London 1999
2. Kalankatuklu Moisey. Albaniya tarixi. Bakı. "Elm" 1993
3. Асадов Ф.М. Арабские источники о тюрках в раннем средневековье. Баку,»Элм»1993
4. Гейбуллаев Г. К этногенезу Азербайджанцев. Баку, «Элм» 1991
5. Джафаров Ю.Р. Гунны и Азербайджан. Баку, «Элм», 1985
6. Джафаров Г.Ф. Связи Азербайджана со странами Передней Азии в эпоху поздней Бронзы и раннего железа. Баку, «Элм», 1984
7. Quran. Tərcümə: Z.Bünyadov, V. Məmmədəliyev. Bakı "Azərnəşr" 1992
8. Оппенхейм А. Древняя Месопотамия. Москва, «Наука» 1980
9. Дюмезиль Ж. Скифы и Нарты. Москва, «Наука» , 1990
10. Фрэзэр Дж.Дж. Золотая ветвь. Москва 1984
11. Токарев С.А. Ранние формы религии. Москва. 1990.
12. Seyidov M. Qam-Şaman və onun qaynaqlarına ümumi baxış. Bakı"Gənclik" 1994
13. Seyidov M. Azərbaycan mifik təfəkkürün qaynaqları. Bakı, "Yazıçı" 1983
14. Əliyev A. Şumer dastanları. Bakı, "AzAtaM", 2008


Qobustan rayonu. Nabur kəndi


Qobustan rayonu Şıxlar kəndi


Qobustan rayonu Nabur kəndi


Qobustan rayonu Sündi kəndi


Qobustan rayonu. Nabur kəndi


Qobustan rayonu. Nabur kəndi


Xızı Rayonu


Qobustan rayonu Pir “Şirin Baba”


Şamaxı rayonu Cabanı kəndi


Şamaxı rayonu Qonaqkənd


Şamaxı rayonu Hacılı kəndi


Qobustan rayonu Cəmcəmli kəndi


Qobustan rayonu Qarabulaq kəndi


Qobustan rayonu Qarabulaq kəndi


Qobustan rayonu Sofu Novruz Piri


Qobustan rayonu Pir Şirin baba


Qobustan rayonu Ərəbqədim kəndi


Lənkəran rayonu


Şabran rayonu Qorqan kəndi


Şabran Sumaxova kəndi


Xızı rayonu Tıxlı kəndi


Ağsu rayonu


Quba rayonu


Quba rayonu


Quba rayonu Xınalıq kəndi



Məhəmməd Peyğəmbər (s.ə.və s.) Merac gecəsi göyün yeddinci qatında
Sidrət al-Müntəha ağacı yanında Cəbrayıl mələki görür. Mir Heydər “Merac namə” Herat 1436
Bibliothèque Nationale de France



Cənnətdə bitən Sidrət al-Müntəha ağacı. XVIII ə. əlyazması. Şəxsi kolleksiya



“Babur Namə”. 16 ə. sonu. Sidrət al-müntəha ağacı.
Metropolitan Museum of Art



Cənnətdə bitən Tuba ağacı.  Əlyazma kitab. 1798.  Chester Beatty Library.









“Həyat ağacı” motivinin Sümer-Babil-Assur  ikonoqrafiyası.
Azərbaycan məzarlarında “Həyat ağacı” ikonoqrafiyasının prototipləri